"Azərbaycan Dövlət Pedaqoji Universitetinin mətbu orqanı"

# GƏNC MÜƏLLİM QƏZETİ

H.Əliyev



"Müəllimlər müəllimi olmaq ikiqat şərəfli və eyni zamanda, ikiqat məsuliyyətli işdir!"




ADPU 100

## Universitetin 100 illik yubileyinə ali diqqət




> *İxtisaslaşmış ali təhsil müəssisəsi kimi Azərbaycan Dövlət Pedaqoji Universiteti müəllim hazırlığı sahəsində və pedaqoji təhsilin inkişafı naminə bu gün də uğurlu fəaliyyəti ilə müstəqil Azərbaycanın inkişafına töhfələrini əsirgəmir.*
>
> ***İlham Əliyev***
> ***Azərbaycan Respublikasının Prezidenti***

### Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 illik yubileyinin qeyd edilməsi haqqında

## AZƏRBAYCAN RESPUBLİKASI PREZİDENTİNİN SƏRƏNCAMI

Azərbaycan Dövlət Pedaqoji Universiteti ölkəmizin təhsil tarixində xüsusi yer tutan, zəngin ənənələrə malik ali təhsil müəssisələrindəndir. Yarandığı vaxtdan etibarən Universitet üzərinə düşən vəzifələri həmişə layiqincə yerinə yetirmiş, respublikamızla yanaşı, bir sıra digər ölkələr üçün elmi-pedaqoji kadr hazırlanması işini müvəffəqiyyətlə həyata keçirmişdir. Azərbaycanın tanınmış ictimai, elm və mədəniyyət xadimləri arasında Universitetin çox sayda məzunları vardır.

İxtisaslaşmış ali təhsil müəssisəsi kimi Azərbaycan Dövlət Pedaqoji Universiteti müəllim hazırlığı sahəsində və pedaqoji təhsilin inkişafı naminə bu gün də uğurlu fəaliyyəti ilə müstəqil Azərbaycanın inkişafına töhfələrini əsirgəmir. Universitetdə qabaqcıl elmi nailiyyətlərdən, innovativ təlim-tədris texnologiyalarından faydalanmaqla ali təhsilin məzmun və keyfiyyət göstəricilərinin təkmilləşdirilməsi istiqamətində zəruri addımlar atılır.

Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 32-ci bəndini rəhbər tutaraq, ölkədə yüksək ixtisaslı pedaqoji və elmi-pedaqoji kadr yetişdirilməsi sahəsində mühüm xidmətlərini nəzərə alaraq, Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 illik yubileyinin qeyd olunmasını təmin etmək məqsədilə qərara alıram:

1. Azərbaycan Respublikasının Təhsil Nazirliyi Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 illik yubileyinə dair tədbirlər planı hazırlayıb həyata keçirsin.

2. Azərbaycan Respublikasının Nazirlər Kabineti bu Sərəncamdan irəli gələn məsələləri həll etsin.

İlham Əliyev
Azərbaycan Respublikasının Prezidenti

Bakı şəhəri, 17 aprel 2021-ci il

## Fizika fakültəsi aprel ayında aktiv fəaliyyət göstərib



səh.3

## ADPU-nun nəzdində Pedaqoji Kollecdə məsafədən tədris yüksək səviyyədə qurulub




səh.4

## ADPU-nun Elmi Şurasının növbəti onlayn iclası keçirilib



səh.2

## ADPU-ya Beynəlxalq əlaqələr üzrə yeni prorektor təyin olunub




səh.2

## ADPU-da Magistrantların IV Respublika Elmi Konfransı keçirilib



səh.5

Qəzet 1958-ci il, fevral ayının 1-dən etibarən nəşr olunur.

63

Aprel, 2021 / № 04 (1107)

## ADPU-nun Elmi Şurasının növbəti onlayn iclası keçirilib

Aprelin 29-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Elmi Şurasının növbəti iclası keçirilib. ADPU-nun rektoru, Elmi şuranın sədri, professor Cəfər Cəfərov ötən iclasdan keçən dövr ərzində baş verən ən mühüm hadisələri vurğulayıb. Professor Cəfər Cəfərov Prezident İlham Əliyevin "Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 illik yubileyinin qeyd edilməsi haqqında" Sərəncamının əhəmiyyətindən söz açıb.

Rektor, həmçinin ADPU-nun nəzdində Azərbaycan Dövlət Pedaqoji Kollecinin bu yaxınlarda distant təhsilin təşkili ilə bağlı "mektebgushesi.az" təhsil portalı tərəfindən ölkə kollecləri arasında keçirdiyi onlayn sorğuda çox böyük fərqlə qalib olduğunu qeyd edib.



Gündəlikdəki məsələlərə dair çıxışlarda tədris işləri üzrə prorektor, dosent Eldar Aslanovun ADPU-da yaz imtahan sessiyası və yekun dövlət attestasiyasına hazırlıqla bağlı təklifləri dinlənilib və şura tərəfindən qənaətbəxş hesab olunub.

Keyfiyyətin təminatı şöbəsinin müdiri, dosent Qalib Şərifov şöbə tərəfindən aprel ayı ərzində keçirilmiş "ADPU-da 2020/2021-ci tədris ili üzrə tələbə məmnuniyyət sorğusu"nun nəticələri haqqında geniş təqdimat edib.

Daha sonra cari məsələlər üzrə müzakirələr aparılıb. Prorektor Eldar Aslanov "Azərbaycan Dövlət Pedaqoji Universitetinin 100 illiyi" yubiley medalının əsasnamə layihəsini şuraya təqdim edib və layihə şura üzvləri tərəfindən müzakirə olunub.

Elm və innovasiyalar üzrə prorektor, professor Asəf Zamanov magistrantların IV Respublika Konfransının materiallarının nəşri, doktorantların dissertasiya mövzuları və universitet alimlərinin monoqrafiyalarının çap olunması ilə bağlı təklif irəli sürüb. Sosial və humanitar məsələlər üzrə prorektor, professor Fikrət Rzayev universitetin 100 illik yubileyi ilə bağlı görülən tədbirlərin vəziyyəti və nəzərdə tutulan əlavə tədbirlər haqqında məlumat verib. İclasda irəli sürülən təkliflərlə bağlı müzakirələr aparılıb.

## Şəhid və qazilərimiz qürur mənbəyimizdir!

### ADPU-nun şəhid məzunu Firdovsi Tahirovun ailəsi ziyarət olunub

Aprelin 3-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Məzun koordinasiya və karyera bölməsinin müdiri Könül Əsgərova universitetin Vətən müharibəsində şəhid olan 11 məzunundan biri Firdovsi Tahirovun ailəsini ziyarət edib. Əslən Lerikin Dico kəndindən olan ailə hazırda Binə qəsəbəsində yaşayır. Ziyarət zamanı şəhidin ailəsi ilə həmsöhbət olan bölmə müdiri K.Əsgərova şəhid atası Balaxan kişiyə universitet rəhbərliyi və elmi-pedaqoji heyəti adından cəsur və nümunəvi övlad tərbiyə etdiyi üçün təşəkkürünü bildirərək dərin ehtiramını bildirib.

### ADPU-nun şəhid məzunu Ceyhun Nüsrətli doğum günündə anılıb

Aprelin 8-də ADPU-nun nümayəndələri universitetin şəhid olan məzunlarından Ceyhun Aqil oğlu Nüsrətlinin doğum günü münasibəti ilə məzarını ziyarət ediblər. Universitetin Tədris Departamentinin Məzun koordinasiya və karyera bölməsinin müdiri K. Əsgərova və Ceyhunun məzunu olduğu Kimya və biologiya fakültəsinin dekanı, dosent Elnarə Mehbalıyeva şəhidin dəfn olunduğu Beyləqan rayonunda rayon icra hakimiyyətinin nümayəndələri, Ceyhunun təhsil aldığı məktəbin müəllimləri və tələbə yoldaşları ilə birgə şəhidin məzarını ziyarət edərək məzarı önünə ADPU rəhbərliyi adından əklil qoyub, xatirəsini ehtiramla yad ediblər.

### "Bizim ölməz şəhid müəllimlərimiz" adlı ingilis dilində vebinar

Aprelin 10-da ADPU-nun baş müəllimi Sevda Ağayevanın təşəbbüsü, universitetin Tarix və coğrafiya fakültəsi və Xarici Dillər Mərkəzinin təşkilatçılığı ilə "Our İmmortal Martyred Teachers" (Bizim ölməz şəhid müəllimlərimiz) adlı ingilis dilində vebinar keçirilib. Vebinar ADPU-nun Vətən müharibəsində şəhid olan tələbə və məzunlarının xatirəsinə həsr olunub. Zoom platformasında keçirilən tədbirdə fakültənin rəhbərliyi və tələbələri, Xarici Dillər Mərkəzinin müəllimləri, ADPU-nun məzunlarından Vətən müharibəsinin yeganə qadın şəhidi Arəstə Baxışovanın məktəbli oğlu Mərdan, Bakı şəhərinin müxtəlif məktəblərindən olan məktəblilər iştirak ediblər.

### ADPU-nun qazi məzunu Elvin Rəsulovla görüş

Aprelin 13-də ADPU-da Vətən müharibəsi qazisi olan məzunlarından Elvin Qubad oğlu Rəsulov və qazimizin anası Ramilə Rəsulova ilə görüş keçirilib. Görüşdə ADPU-nun rektoru professor Cəfər Cəfərov, Tədris işləri üzrə prorektoru dosent Eldar Aslanov, Tədris departamentinin müdiri dosent Sənan Əliyev və rektor köməkçisi Riyad Rüstəmli iştirak edib. Prof. C.Cəfərov qazimizin səhhəti ilə maraqlanaraq qazi anası Ramilə xanıma belə mərd və cəsur övlad yetişdirdiyi üçün minnətdarlığını ifadə edib. Prof. C.Cəfərov qeyd edib ki, ADPU hər zaman öz şəhid və qazi məzunlarını diqqətdə saxlayır.



### ADPU-nun şəhid məzunu Orxan Nəbiyevin ailəsi ziyarət olunub

ADPU-nun Yeni Azərbaycan Partiyası Gənclər Birliyinin (ADPU YAP GB) sədri Tərlan Ağayev və ADPU-nun Şamaxı filialının YAP GB-nin sədri Məhərrəm Məhərrəmli Vətən müharibəsi şəhidi, ADPU-nun Şamaxı filialının məzunu, leytenant Orxan Nəbiyevin ailəsini ziyarət ediblər. Orxanın atası Rza Nəbiyev göstərilən diqqətə görə təşəkkürünü bildirib. T. Ağayev ADPU rəhbərliyi adından Vətən müharibəsində şəhid və qazi olan bütün tələbə və məzunların daim universitetin diqqətində olduğunu, universitetdə və filiallarda xatirələrinin əbədiləşdirilməsi ilə bağlı tədbirlərin görüldüyünü diqqətə çatdırıb. Şəhidin anası Sevinc xanım Orxanın hərbi formadakı şəklini ADPU ailəsinə hədiyyə edib.

### ADPU – nun Quba filialında Aprel qazisi Üzeyir Nəcəfov ilə görüş keçirilib

Aprelin 3-də ADPU-nun Quba filialında Tələbə Gənclər Təşkilatının (TGT) təşəbbüsü və filialın Kitabxana müdiri Samirə Hacıyevanın, filialın TGT sədri Səyyad Nəcəfovun təşkilatçılığı ilə 2016- cı ilin Aprel döyüşlərinin iştirakçısı, snayper ixtisaslı kəşfiyyatçı, qazi Üzeyir Nəcəfov ilə onlayn görüş keçirilib.

## ADPU-ya Beynəlxalq əlaqələr üzrə yeni prorektor təyin olunub




Azərbaycan Respublikasının Təhsil nazirinin müvafiq əmri ilə professor Mahirə Hüseynova Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Beynəlxalq əlaqələr üzrə prorektoru təyin olunub.

Professor Mahirə Hüseynova 1960-cı ildə NMR-in Babək rayonunda anadan olmuşdur. 1968-ci ildə Xalxal kənd səkkizillik orta məktəbin birinci sinifinə daxil olmuş, orta təhsilini Mehdi Hüseynzadə adına Novxanı qəsəbə 1 saylı orta məktəbində davam etdirmişdir. 1980-ci ildə V.İ.Lenin adına APİ-nin (indiki ADPU-nun) Filologiya fakültəsinə daxil olmuşdur. 1984-cü ildə institutu fərqlənmə diplomu ilə bitirərək bir müddət orta məktəbdə müəllim işləmiş, fəaliyyəti dövründə Təhsil Nazirliyi tərəfindən "Respublikanın qabaqcıl təhsil işçisi" adına layiq görülmüşdür. 2003-cü ildə "İlin nümunəvi müəllimi" Respublika müsabiqəsinin qalibi olmuşdur. 2012-ci ildə namizədlik dissertasiyasını müdafiə edərək "filologiya üzrə fəlsəfə doktoru" elmi adını almışdır. 2015-ci ilin mayında ADPU-nun Müasir Azərbaycan dili kafedrasının dosenti, dekabrında isə müdiri olmuşdur. M.Hüseynova 2017-ci ildə filologiya üzrə elmlər doktoru elmi dərəcəsi almışdır. 1 il sonra isə ADPU-nun Müasir Azərbaycan dili kafedrasının professoru seçilmişdir. 2018-ci ildən indiyə qədər ADPU-nun "Filologiya" fakültəsinin dekanı vəzifəsində çalışmışdır. M.Hüseynova həmçinin Prezident təqaüdçüsü, "Qızıl qələm" və "İlin alimi" Media Mükafatı laureatıdır. Professor 30-dan çox elmi, 15 bədii kitabın və 1000-ə yaxın şeirin müəllifidir. 100-dən çox şeirinə musiqi bəstələnmişdir. 2020-ci ildə Türkiyədə keçirilmiş musiqi festivalında M.Hüseynovanın müəllifi olduğu "Vətəndir" şeirinə məşhur türk bəstəkar Ərdoğan Tozoğlu musiqi bəstələmişdir.

## Yeni qəbul olunan doktorant və dissertantlarla görüş



Aprelin 7-də ADPU-da 2020-ci ildə universitetin fəlsəfə doktoru üzrə doktorantura və dissertanturasına, elmlər doktoru üzrə dissertanturasına qəbul olunan doktorant və dissertantlarla görüş keçirilib. Görüşdə ADPU-nun rektoru professor Cəfər Cəfərov, Elm və innovasiyalar üzrə prorektor professor Asəf Zamanov və Magistratura və doktorantura şöbəsinin müdiri professor İbrahim Bayramov iştirak edib.

Prof. C.Cəfərov doktorant və dissertantlara uğurlar arzulayaraq onlara vaxtı dəyərləndirməyi və öz tədqiqatlarında, o cümlədən universitetin işində aktiv olmaqla yeniliklərin təşviqində fəal rol almağı tövsiyyə edib.

Çıxış edən prof. A.Zamanov bildirib ki, Bakı şəhərində fəlsəfə fənnindən doktorantura və dissertanturaya qəbul imtahanları keçirmək hüququ yalnız üç ali məktəbə verilib ki, onlardan biri ADPU-dur. Prorektor diqqətə çatdırıb ki, bu il universitetə 3 nəfər elmlər doktoru, 10 nəfər isə fəlsəfə doktoru hazırlığı proqramı üzrə qəbul olunub. Daha sonra doktorant və dissertantlara vəsiqələr təqdim edilib.

Çıxış edən doktorant və dissertantlardan Könül Həsənova, Məhbubə Məmmədova, Samirə Əliyeva ADPU-da elmi tədqiqatlar üçün yaradılan geniş imkanlara görə öz təşəkkürlərini bildiriblər.

## Fizika fakültəsi aprel ayında aktiv fəaliyyət göstərib

**Elmi konfrans: "Gələcəyə addım" III**

Aprelin 12-də Fizika fakültəsi Tələbə Elmi Cəmiyyətinin (TEC) onlayn "Gələcəyə addım" III elmi konfransı keçirilib. Konfransda universitetin rektoru, professor Cəfər Cəfərov və elm və innovasiyalar üzrə prorektor, professor Asəf Zamanov çıxış edib. Fizika fakültəsinin dekanı, dosent Arzu Daşdəmirov qeyd edib ki, fakültədə ilk dəfə 2017-ci ildə keçirilən TEC-in "Gələcəyə addım" elmi konfransına bu il pandemiyaya baxmayaraq ADPU ilə yanaşı müxtəlif ali təhsil ocaqlarından rekord sayda - 86 tezis təqdim edilib. İştirakçılara sertifikat, hər bölmə üzrə 3 ən yaxşı məruzəyə isə diplom veriləcək və konfrans materialları dərc olunacaq. Konfransa ADPU-nun və BDU-nun professor-müəllim heyəti, tələbə və magistrantlar daxil olmaqla 300-dən çox iştirakçı qatılıb. Konfrans işini 6 bölmədə davam etdirib. Sonda bölmə sədrlərinin hesabatı dinlənilib.



**"Praktik Bacarıqlar Mərkəzi"nin növbəti onlayn seminarı keçirilib**

Aprelin 13-də Fizika fakültəsinin "Praktik Bacarıqlar Mərkəzi"nin növbəti onlayn seminarı keçilib. Seminarda fakültənin dekanı, dosent Arzu Daşdəmirov, Fizikanın tədrisi texnologiyası kafedrasının müdiri, dosent Sevinc Cəlilova, Magistratura və doktorantura şöbəsinin müdiri, professor İbrahim Bayramov, dosent Əfqan Kərimov, baş müəllim Gülşən Musayeva, baş müəllim Tofiq Hacıyev, I və II kurs magistrantlar iştirak edib. Seminarda dosent, p. ü. f. d. Dilbər Əliyeva "Magistr dissertasiyasının tərtibinə verilən tələblər" mövzusunda təqdimatla çıxış edib və iştirakçıların sualları cavablandırılıb.

**Onlayn seminarda Amerika və Azərbaycan məktəblərində fizikanın tədrisindən danışılıb**

Aprelin 14-də Fizika fakültəsində növbəti onlayn elmi seminar keçirilib. Seminarda ADPU-nun Keyfiyyətin təminatı şöbəsinin müdiri, dosent Qalib Şərifov "Amerika və Azərbaycan məktəblərində fizikadan məsələ həllində vektorlardan istifadənin didaktik əsasları" mövzusunda çıxış edib. Məruzəçi ABŞ və Azərbaycan məktəblərində vektor anlayışının tədrisinin müqayisəli təhlili ilə bağlı apardığı araşdırmanı təqdim edib. Professor İ.İsmayılov, dosent Ş.Xəlilov, dosent Ə.Kərimov, fakültənin dekanı, dosent A.Daşdəmirov və b. mövzu üzrə fikirlərini bildiriblər.

**Fakültə Elmi Şurasının növbəti iclası keçirilib**

Aprelin 19-da Fizika fakültəsinin Elmi Şurasının onlayn formatda növbəti iclası keçirilib. İclasın gündəliyinə Pedaqoji təcrübənin gedişi, 2019/2020 - ci tədris ili üçün "Fizikanın tədrisi metodikası və texnologiyası", "Texnologiya fənninin tədrisi metodikası və metodologiyası" ixtisaslaşması üzrə magistrantların dissertasiya işlərinin vəziyyəti və Tədrisdə cari keyfiyyət göstəricilərinin müzakirəsinə (kollekvumların keçirilməsi vəziyyəti, kurs işi və sərbəst işlərin yerinə yetirilmə vəziyyəti) dair məsələlər daxil edilib.

## ADPU-nun dosenti Əfqanıstanda Əmir Əlişir Nəvai konfransında iştirak edib

07 - 09 aprel 2021-ci il tarixlərində Əfqanıstan İslam Respublikasının Herat şəhərində görkəmli özbək şairi Əmir Əlişir Navainin 580 illik yubileyi münasibətilə keçirilən beynəlxalq konfransda Azərbaycan alimləri də yüksək səviyyədə təmsil olunmuşlar. Konfransda ölkəmizi AMEA N.Gəncəvi adına Ədəbiyyat İnstitutunun professoru Almaz Ülvi və AMEA A.Bakıxanov adına Tarix İnstitutunun aparıcı elmi işçisi, ADPU-nun Azərbaycan tarixi kafedrasının dosenti, tarixçi - alim Mübariz Ağalarlı təmsil etmişdir.



Açılış mərasimində çıxış edən Azərbaycan alimləri Azərbaycan-Əfqanıstan əlaqələrinin çoxəsrlik tarixə malik olduğunu vurğulayaraq II Qarabağ savaşında dost ölkə olaraq Azərbaycana siyasi dəstək verən Əfqanıstan dövlətinə və əfqan xalqına öz təşəkkürlərini bildirmişlər. M.Ağalarlı çıxışında Ə.Nəvai dövründə Azərbaycan dövlətləri ilə Teymurilər dövləti arasında diplomatik-siyasi və mədəni əlaqələrin inkişaf etdiyini, bu əlaqələrin möhkəmləndirilməsində özbək şairi Ə.Nəvai, Azərbaycan ədibləri Kişvəri, Həbibi kimi ədəbi şəxsiyyətlərin böyük rolunun olduğunu qeyd edib. Konfrans çərçivəsində Əfqanıstan Elmlər Akademiyasının prezidenti, professor Abdul Zahir Şakibin rəhbərlik etdiyi elmi heyətlə görüşən alimlər iki ölkə arasında elmi əlaqələrin inkişaf perspektivlərini müzakirə ediblər. Alimlər həmçinin Herat şəhərində Azərbaycan əsilli qızılbaş, bayat, əfşar, qacar, mərvi və türkmanların nümayəndələri ilə də görüşüblər.

## ADPU-nun Şəki filialı karantinə bağlanıb

Aprelin ortalarında ADPU-nun Şəki filialı karantinə bağlanıb. ADPU-nun mətbuat katibi Cavid Hüseynov bildirib ki, hazırda filialda dərslər distant formada təşkil olunur: *"Nazirlər Kabinetinin qərarı ilə ADPU-nun Şəki filialında da 30 faiz işçi işə davam edirdi. Hazırda həmin 30 faiz işçi arasında çoxlu sayda koronavirusa yoluxma qeydə alındığı üçün filialda iş rejimi 2 həftəlik karantinə bağlanıb".*

## ADPU-nun müəllimi Macarıstan və Ukraynada beynəlxalq elmi konfranslarda iştirak edib




Martın 26-da Macarıstanda keçirilən "İKSAD INTERNATIONAL CONGRESS ON SOCIAL SCIENCES-VI" Beynəlxalq Elmi Konfransında ADPU-nun Filologiya fakültəsinin müəllimi İlkin Əsgərov ***"Azərbaycan dilində bəzi ərəb-fars mənşəli morfemlərin funksional xüsusiyyətləri"* adlı məruzə ilə çıxış etmişdir.**

Bundan başqa, martın 26-27-də Ukraynanın Oles Hončar Dnepr Milli Universitetində keçirilən "Dəyişən Dünyada Təhsil və Elm: Problemlər və İnkişaf perspektivləri" III Beynəlxalq Elmi Konfransının materiallarında İ.Əsgərovun ingilis dilində ***"USAGE PROPERTIES OF –DAŞ MORPHEME IN THE DERIVATOLOGICAL SYSTEM OF OGHUZ GROUP TURKIC LANGUAGES (ON AZERBAIJAN AND TURKISH LANGUAGES)"*** adlı məqaləsi də yayımlanıb.

## "Nizami Gəncəvi dövrünün böyük mütəfəkkiri kimi" mövzusunda seminar

ADPU-nun Tədris Departamentinin Məzun Koordinasiya və Karyera Bölməsi ilə Bakı şəhəri 328 nömrəli tam orta məktəbin əməkdaşlığı çərçivəsində ***"Nizami Gəncəvi dövrünün böyük mütəfəkkiri kimi"*** mövzusunda seminar keçirilib. Tədbirdə məktəbin müəllimləri və yuxarı siniflərin istedadlı şagirdlərindən ibarət "Kiçik Akademiya"sının üzvləri iştirak edib.

Seminarda ADPU-nun Ədəbiyyat kafedrasının müdiri, dosent Razim Məmmədovun Nizami yaradıcılığının müasir dövr üçün aktual məsələləri haqqında dolğun məruzəsi maraqla qarşılanıb. Universitetin Məzun Koordinasiya və Karyera bölməsinin müdiri Könül Əsgərova və məktəbin direktoru Asif Nəbiyev tədbirin gedişindən razılıqlarını ifadə edərək əməkdaşlığın daha da inkişaf etdirilməsinin vacibliyini vurğulayıblar.

## ADPU alimlərinin kitabları beynəlxalq müstəvidə

**"Məkan məlumatlarının təhlili" fənni üzrə Azərbaycanda ilk dərs vəsaiti**

Avstraliyanın Makkuori Universitetinin Ekoloji elmlər fakültəsinin professoru Əliəkbər Rəsuli, AMEA-nın Torpaqşünaslıq və Aqrokimya İnstitutunun direktoru, akademik Qərib Məmmədov və ADPU-nun Ümumi coğrafiya kafedrasının dosenti Mətanət Əsgərovanın həmmüəllifliklə ***"Mastering Spatial Data Analysis Inside the GIS Setting (Məkan məlumatlarının təhlili CİS daxilində)"*** adlı ingilis dilində dərs vəsaiti çap olunub. ADPU-nun Elmi-Metodiki Şurasının 23.12.2020-ci il tarixli, 01 saylı qərarı ilə "Coğrafiya müəllimliyi" və "Tarix və coğrafiya müəllimliyi" ixtisaslarının yeni tədris planına salınmış "Məkan məlumatlarının təhlili" fənninin tədrisi üçün dərsliyin nəşri tövsiyə olunub. Kitab bu fənn üzrə Azərbaycanda ilk dərs vəsaitidir. Qeyd edək ki, vəsait Vətən müharibəsi şəhidlərinin əziz xatirələrinə həsr olunub.

Dərslik CİS və şəkillərin emalı, məkan məlumatlarının təhlili sahələrində çalışan kadrlara və mütəxəssislərə böyük fayda verə bilər.

**"Sociocultural Fundamentals of Education" kitabı dünyanın 10 dilinə tərcümə olunub**

ADPU-nun "Ümumi pedaqogika" kafedrasının dosenti, ped. ü. f. d. Müslüm Nəzərovun ilk dəfə 2020-ci ildə Almaniyada ingilis dilində nəşr olunan "Sociocultural Fundamentals of Education" ("Təhsilin sosiomədəni əsasları") kitabı artıq Latın Amerikası, Rusiya və Avropanın 10 ölkəsində oxuculara təqdim olunub. Kitabda müasir təhsil sisteminin qlobal xarakterindən, şəxsiyyətyönlü təhsildən, təhsilin cəmiyyət həyatının əlaqələndirici halqası və inkişaf xətti olmasından bəhs olunaraq çağdaş dövr təhsilinin sosiomədəni əsasları araşdırılır.

## ADPU-nun professoruna Qazaxıstan Respublikasının Mədəniyyət və İdman Nazirliyinin "Təşəkkür Məktubu" təqdim edilib




ADPU-nun Filologiya fakültəsinin professoru, "ADPU-nun Türk Araşdırmaları Elmi-tədqiqat Mərkəzi"nin rəhbəri Elman Quliyev qazax ədəbiyyatı və mədəniyyətinin tədqiq və təbliğindəki xidmətlərinə görə bu ölkənin Mədəniyyət və İdman Nazirliyinin "Təşəkkür Məktubu" ilə təltif edilib. Aprelin 21-də Qazaxıstan Respublikasının Azərbaycandakı səfirliyində keçirilən mərasimdə səfir Serjan Abdıkarimov "Təşəkkür məktubu"nu professora təqdim edib.

## ADPU-nun rektoru beynəlxalq konfransda çıxış edib




Aprelin 22-25-i tarixlərində AR Təhsil İnstitutunun dəstəyi, Təhsil İdarəçiləri Assosiasiyası və T-Network təhsil işçilərinin təcrübə və kommunikasiya platformasının təşkilatçılığı ilə keçirilən "Təhsil İdarəçiliyi Beynəlxalq Konfransı"nın ilk günündə ADPU-nun rektoru, professor Cəfər Cəfərov ***"Təhsildə dəyişikliklərin idarə olunması"*** mövzusunda çıxış edib. Rektor bildirib ki, koronovirus pandemiyası nəticəsində təhsil sektorunda uzunmüddətli strategiya və qaydaların yenidən işlənilməsinə ciddi ehtiyac var. Bu barədə UNESCO-nun da açıqlamaları mövcuddur. "Bu dəyişikliyə ölkəmiz çox çevik reaksiya verib və "Azərbaycan 2030: sosial-iqtisadi inkişafa dair Milli Prioritetlər" dövlətimizin başçısı tərəfindən təsdiq olunub. "Qüdrətli dövlət və yüksək rifah cəmiyyəti" adı ilə verilmiş beş əsas prioritetdən üçüncüsü əsasən təhsil sahəsini əhatə edir. Tədris prosesi və təhsil idarə edilməsi "XXI əsrin tələblərinə uyğun təhsil" və "Yaradıcı və innovativ cəmiyyət" altprioritetlərinə uyğun qurulmalıdır. Prof. C.Cəfərov Azərbaycandakı universitet idarəçiliyində dəyişikliklərin idarə olunması haqqında danışarkən bu il ADPU-nun 100 yaşını qeyd edəcəyini diqqətə çatdıraraq deyib: "Pedaqoji Universitet "ADPU-2021 strateji inkişaf planı"na uyğun olaraq son 5 ildə mühüm dəyişikliklərdən keçib. Məzunların son 5 ildə MİQ imtahanlarındakı nəticələri sürətlə yaxşılaşıb. 100 illik yubileydən sonra ADPU-nun 2025-ci il üçün strateji planında bu istiqamətlər nəzərə alınacaq: ***– Təhsilalanlara vətən, dövlət, tarix sevgisi aşılanmalı; – Təhsilalanların milli mənlik süzgəcindən keçməsi; – Təhsilalanlar öz ölkəsinin quruculuğuna xidmət etməli; – Vətən sevgisi və müstəqil öyrənmə bacarıqlarının formalaşdırılması; – Rəqəmsal biliklər və xarici dil bacarıqlarının verilməsi."***

*Xatırladaq ki, konfransda 9 ölkədən tədqiqatçı, alim və təhsil işçiləri iştirak edirlər.*

## Onlayn elmi seminar: "İngilis ədəbiyyatında Nizami yaradıcılığının tədqiqi"




Azərbaycan Respublikasında 2021-ci ilin "Nizami Gəncəvi İli" elan edilməsi haqqında Prezident İlham Əliyevin Sərəncamı ədəbiyyatımıza, milli-mənəvi dəyərlərimizə olan münasibətindən qaynaqlanır. ADPU-nun Beynəlxalq əlaqələr üzrə prorektoru, Filologiya fakültəsinin dekanı vəzifəsini icra edən, professor Mahirə Hüseynovanın təşkilatçılığı ilə Filologiya fakültəsində "Nizami Gəncəvi İli" ilə bağlı silsilə tədbirlər keçirilir. Bu tədbirlərin davamı olaraq aprelin 23-də fakültədə fəaliyyət göstərən Xarici Dillər Mərkəzində onlayn elmi seminar keçirilib. Tədbirdə fakültənin professor-müəllim heyəti və tələbələri iştirak ediblər. Prof. M.Hüseynova seminarı açıq elan etdikdən sonra b/m. Yasəmən Babayeva ***"İngilis ədəbiyyatında Nizami yaradıcılığının tədqiqi"*** adlı maraqlı məruzə ilə çıxış edib. Fakültənin əməkdaşları, dos. N.Abdullazadə, dos. R.Məmmədov, prof. N.Sadıqova, prof. E.Quliyev, dos. F.İsayeva, dos. N.Əlizadə, dos. T.Rəhimli məruzə ilə bağlı təəssüratlarını bölüşüblər. Sonra tələbələrdən R.İsmayılov, F.Əliyev və İ.Kərimovanın məruzəçiyə sualları cavablandırılıb. Sonda prof. M.Hüseynova məruzədən razı qaldığını bildirərək gənc müəllimə gələcək işlərində uğurlar arzulayıb.

## Universitetimizin alimi Azərbaycanın fizika üzrə ən gənc elmlər doktoru oldu

ADPU-nun Fizika fakültəsinin dosenti, f. ü. f. d. Sakin Cabarov fizika üzrə elmlər doktoru elmi dərəcəsi almaq üçün dissertasiya işini uğurla müdafiə edib. Aprelin 21-də AMEA Fizika İnstitutunda keçirilən müdafiədə alim ***"Perovskitlərdə və heksaferritlərdə təzyiq və temperaturun təsiri ilə quruluş və maqnit faza keçidləri"*** mövzusunda elmi tədqiqat işi ilə bağlı əldə etdiyi nəticələri təqdim edib. Tədqiqat mövzusu və əldə edilən nəticələr Azərbaycan fizika elmində ciddi irəliləyişdir. S.Cabarov müasir dövrdə ölkəmizdə fizika sahəsində elmlər doktorluğu üzrə dissertasiya işi müdafiə edən ən gənc alimdir. Elmi tədqiqat işlərini Rusiya və Almaniyanın tanınmış mərkəzlərində icra edən alim "Web of Science" və "Scopus" bazalarında indeksləşən jurnallarda çap olunan yüksək impakt faktorlu məqalələrin müəllifidir. Beynəlxalq səviyyədə əsərlərinə çoxsaylı istinadlar verilib.



## ADPU-da "Davam" Gənclər Hərəkatının nümayəndələri ilə görüş keçirilib

Aprelin 23-də ADPU-da "Davam" Gənclər Hərəkatının nümayəndələri ilə görüş keçirilib. "Davam" Gənclər Hərəkatının sədri Nihad Allahyarlı və ali təhsil müəssisələri ilə iş üzrə katib Sabir Rüstəmov Hərəkatın universitetlə əməkdaşlıq imkanlarından və tələbələrin ictimai fəallığına göstərə biləcəyi müsbət təsirdən danışıblar. Universitetin rektoru, professor Cəfər Cəfərov ADPU-da tələbələrin ictimai fəallığının yüksək olduğunu və lazımi səviyyədə əməkdaşlıq imkanlarının mövcudluğunu vurğulayıb.



Görüşdə ADPU-nun tədris işləri üzrə prorektoru, dosent Eldar Aslanov, sosial və humanitar məsələlər üzrə prorektor, professor Fikrət Rzayev, rektorun köməkçisi Riyad Rüstəmli, Tələbələrlə iş və ictimaiyyətlə əlaqələr şöbəsinin müdiri Turan Kərimli iştirak ediblər.

## 100 İLLİK VƏ 30 İLLİK YUBİLEYLƏR ƏRƏFƏSİNDƏ

Universitetin Şamaxı filialında ADPU-nun 100 illik və Şamaxı filialının 30 illik yubileyinə həsr olunmuş ***"Respublikamızda milli-pedaqoji kadrların hazırlanmasında ADPU-nun rolu"*** mövzusunda onlayn elmi-praktik konfrans keçirilib. Filialın direktoru, dosent Tünzalə Yusifova 1921-ci ildə ADPU-nun və 1991-ci ildə onun Şamaxı filialının yaranma tarixi barədə məlumat verərək universitetin xüsusən son illərdə rektor, professor Cəfər Cəfərovun rəhbərliyi ilə Azərbaycanın ən nüfuzlu ali məktəblərindən birinə çevrilməsindən danışıb. *"ADPU-nun 100 illik yubileyinin qeyd olunması barədə"* Sərəncam imzalaması Cənab Prezident İlham Əliyevin təhsil sahəsinə qayğısının növbəti təcəssümüdür.




Konfransda professor Məlikməmməd Cəbrayılov *"ADPU respublikada pedaqoji təhsilin bayraqdarıdır"* mövzusunda, ADPU-nun məzunlarından olan BDU-nun dosenti Mirələm Vəliyev ADPU-nun ölkəmiz və bir sıra xarici dövlətlər üçün kadr hazırlığındakı müstəsna xidmətləri haqda, uzun illər filialın direktoru olmuş, hazırda filialın Sosial və pedaqoji elmlər kafedrasının müdiri vəzifəsini icra edən dos. Mayıl Alıcanov filialda yüksək elmi potensiallı kadrların fəaliyyət göstərməsi ətrafında, filialının tədris və elmi işlər üzrə direktor müavini, f.ü.f.d. Şəsəddin Mikayılov *"ADPU-nun fəaliyyətində Heydər Əliyev erası"* və kafedranın müəllimi Yaqut Qasımova *"Elmi pedaqoji kadrların hazırlanması günün aktual problemidir"* mövzularında çıxışlar ediblər.

## ADPU-nun nəzdində Pedaqoji Kollecdə məsafədən tədris yüksək səviyyədə qurulub

ADPU-nun nəzdində Azərbaycan Dövlət Pedaqoji Kollecində (ADPK) məsafədən tədris yüksək səviyyədə qurulub. Belə ki, 2019/2020-ci tədris ilinin yaz semestrindən COVİD-19 pandemiyası ilə əlaqədar kollecdə tədrisin onlayn təşkilinə başlanılmışdır. Artıq bu gün tələbələrin 96%-i, müəllimlərin isə 100%-i onlayn tədris prosesinə qoşulub. ADPK-da internet resurslarından istifadəni təmin etmək məqsədilə müvafiq infrastruktur yaradılıb və müəllimlərin aktiv şəkildə dərslərə qoşulmaları təmin edilib.




Pedaqoji Kollecdə distant təhsilin təşkili və daha da təkmilləşdirilməsi məqsədilə "Moodle Tədrisin İdarə olunması Sistemi" və "Microsoft Teams" platformaları birgə tətbiq edilir. MS Teams platforması onlayn rejimdə müəllim və tələbələrin birgə təmas qurmaları üçün unikal virtual sinif imkanları yaradır. Moddle platformasının əsas üstünlüyü isə tədris zamanı kurs materialları, çalışma və tapşırıqların istənilən vaxt əlçatanlığı, tədris mühitinin asanlıqla təşkili, vaxt itkisinin qarşısının alınması və müasir tədris mühiti formalaşdırmasıdır. Kollec Moddle platformasındakı xidmətlərini https://e-tedris.adpk.edu.az ünvanında təqdim edir.

Məqsədli işlərin nəticəsidir ki, ADPU-nun nəzdində ADPK həm də bu yaxınlarda böyük fərqlə Mektebgushesi.az təhsil saytının ölkə kollecləri arasında keçirdiyi "Distant təhsil sınağı" virtual sorğusunun qalibi olub. Sorğuda iştirak edən 10.603 respondentin 3433-ü pedaqoqlara səs verib.

## ADPU-da Magistrantların IV Respublika Elmi Konfransı keçirilib



27-28 aprel 2021-ci il tarixlərində ADPU-da onlayn formatda ***"Pedaqoji elmlərin nəzəriyyəsi və praktikasının aktual problemləri: müasir yanaşma" Magistrantların IV Respublika Elmi Konfransı*** keçirilmişdir. Konfrans ADPU-nun 100 illiyinə həsr edilmişdir. Respublika Elmi Konfransında ADPU, BDU, ADNSU, NDU və digər ali məktəblərin magistrantlarının 450-yə qədər məruzələri dörd bölmədə dinlənilib və müzakirə edilib.

Konfransı ADPU-nun rektoru, professor Cəfər Cəfərov açaraq son illərdə universitetin təhsil və elm sahəsindəki nailiyyətləri barədə məlumat verib. Rektor vurğulayıb ki, ADPU-da magistratura səviyyəsində həyata keçirilən layihələr magistr hazırlığına müsbət təsirini göstərir.

Elm və innovasiyalar üzrə prorektor, professor Asəf Zamanov çıxışında ADPU-da elmi-tədqiqat işlərinin səviyyəsinin yüksəldiyini, professor-müəllim heyətinin impakt-faktor göstəricili jurnallarda dərc edilən elmi məqalələrinin sayının artdığını bildirmiş, magistrantların elmi yaradıcılığına daim diqqət göstərildiyini vurğulamışdır. ADPU-nun təsisçiliyi ilə "MAGİSTRANT" dövri-elmi jurnalının nəşr edilməsi (Jurnalın ilk nömrəsi bu günlərdə elmi ictimaiyyətə təqdim ediləcəkdir.) universitetdə aparılan məqsədyönlü elmi fəaliyyətin məntiqi nəticəsidir. Prof. A. Zamanov bildirdi ki, konfransın elmi bölmələrində mütəxəssislər tərəfindən müsbət qiymətləndirilən məruzələrin tezisləri, həmçinin məqalələr toplu şəklində çap edilib magistrantlara çatdırılacaqdır. ADPU-nun bir sıra professorları, dekan və kafedra müdirləri çıxış edərək konfransın təşkilini yüksək qiymətləndirmişlər.

Plenar iclasda ADPU-nun magistrantı Zeynəb Abdullayeva "Təhsilin idarə edilməsində menecment işinin elmi-pedoqoji əsasları", ADNSU-nun magistrantı Ruhəngiz Qurbanova "Qeyri-səlis məntiqə əsaslanan PID nəzarətçinin dizaynı", BDU-nun magistrantı Tamilla Babayeva "Lənkəran-Astara iqtisadi rayonunda kənd məskunlaşması və onun inkişafında yaranan problemlər" mövzusunda məruzələrlə çıxış ediblər. Sonra konfrans işini iki gün ərzində "İnnovasiyalar və təhsilin keyfiyyəti", "Təhsilin təşkili və idarə edilməsi", "Təhsildə sosial-psixoloji xidmət" və "Tədrisin müasir problemləri" bölmələrində davam etdirib və uğurla yekunlaşıb.

## ADPU-nun Kitabxana-İnformasiya Mərkəzinə yeni kitablar daxil olub

ADPU-nun Kitabxana-İnformasiya Mərkəzinə Azərbaycan Respublikası Təhsil İnstitutu tərəfindən 16 adda 340 nüsxə, M.Y.Lomonosov adına Moskva Dövlət Universitetinin Bakı filialının rektoru, AMEA-nın vitse-prezidenti, akademik Nərgiz Paşayeva tərəfindən Azərbaycanın görkəmli yazıçısı, ədəbiyyatşünas alim, Azərbaycanın əməkdar elm xadimi, pedaqoq, filologiya elmləri doktoru, professor Mir Cəlal Paşayevin həyatı, ədəbi mühiti, elmi və pedaqoji fəaliyyəti haqqında professor Teymur Əhmədovun "Mir Cəlal: Ömrün mənalı anları" iki cildlik kitabının hər birindən 3 nüsxə, yazıçının əsərlərinin beş cildliyinin hər birindən 5 nüsxə, Bakı Beynəlxalq Multikulturalizm Mərkəzindən "Azərbaycan multikulturalizminin qaynaqları" seriyasından ikinci kitabı olan "Azərbaycan multikulturalizminin elmi -fəlsəfi və ictimai-publisistik qaynaqları" kitabından 1 nüsxə hədiyyə olunmuşdur.

***Əziz oxucu! Kitabxanaya yeni daxil olan kitabların kataloqu ilə aşağıdakı QR kodu smartfonunuzda oxudaraq tanış ola bilərsiniz:***



## Fakültələrdə müxtəlif mövzularda seminarlar keçirilib

**"Ekoloji problemlər" mövzusunda onlayn elmi-praktik seminar keçirilib**



Aprelin 21-də ADPU-nun Kimya və biologiya fakültəsinin Biologiya və onun tədrisi texnologiyası kafedrasının "Ekoloji problemlər" mövzusunda onlayn elmi-praktik seminarı keçirilib. Seminarda ADPU-nun elm və innovasiyalar üzrə prorektoru, professor Asəf Zamanov, tədris işləri üzrə prorektor, dosent Eldar Aslanov, Tədris Departamentinin direktoru, dosent Sənan Əliyev, Elmi-təşkilatı şöbənin müdiri, professor Əli Allahverdiyev, Kafedranın müdiri, dosent Anaxanım Yusifova fakültənin rəhbər-müəllim və tələbə heyəti iştirak edib.

Daha sonra fakültənin müəllimləri, b.ü.f.d. B.Əsədova, b.ü.f.d. Ş.Əsədova, Z.Məlikova, tələbələr L.Əsədova, A.Əsgərova, H.Ağalıyeva və A.Sədirli müxtəlif ekoloji problemlərə həsr olunmuş məruzələrlə çıxış ediblər. Sonda prorektor E.Aslanov məhsuldar müzakirələrdən razılığını ifadə edib. Həmçinin prof. Ə.Allahverdiyev, fakültənin professoru Ə.Fərəcov, dosent Ə.Məhərrəmov və başqaları da öz fikirlərini bölüşüblər.

**ADPU-da tarixçi-alim Dilavər Əzimlinin xatirəsinə həsr olunmuş elmi seminar keçirilib**

Aprelin 22-də universitetin Azərbaycan tarixi kafedrasının təşkilatçılığı ilə tarixçi-alim Dilavər Əzimlinin xatirəsinə həsr olunmuş elmi seminar keçirilib. Giriş sözü ilə çıxış edən universitetin rektoru, D.Əzimlinin müəllimi olmuş professor Cəfər Cəfərov onun tələbəlik illərindən, pedaqoji fəaliyyətindən danışıb. Kafedranın müdiri, dosent Naibə Əhmədova və dosenti Mübariz Ağalarlı, AMEA A.Bakıxanov adına Tarix İnstitutunun əməkdaşı, dosent Fərəh Hüseyn alimin yaradıcılığının müxtəlif aspektləri üzrə məruzələr etmişlər. Prof. Z.Bayramov, prof. X.Məmmədov, prof. N.Musalı, prof. X.İbrahimli, dos. B.Əziz, dos. H.Həsənov, b/m. Ş.Qurbanova və tələbələri adından A.Salehoğlu D.Əzimliylə bağlı xatirələrini bölüşüblər. Sonda mərhumun həyat yoldaşı Arzu Qazıyeva alimin ailəsi adından ADPU rəhbərliyinə və seminar iştirakçılarına öz təşəkkürünü bildirib. Xatırladaq ki, Dilavər Əzimli ADPU-nun Azərbaycan tarixi kafedrasının dosenti idi. Alim martın 3-də koronavirus infeksiyasının qurbanı olmuşdur.



## Məşhur məzunlarımız

***Əziz oxucular! Universitetimizin 100 illik yubileyində "Gənc Müəllim" məşhur məzunlarımızı sizlərə tanıtmaqda davam edir.***

### Əhməd Cəmil



Əhməd Cəmil 1913-cü il oktyabrın 20-də İrəvan şəhərində kustar sənətkar ailəsində doğulmuşdur. Dörd yaşında ikən atasını itirmişdir. İbtidai və orta təhsili Gəncə şəhər məktəblərində almışdır. Yeddinci sinifdə oxuyarkən, 1928-ci ildə "Qızıl Gəncə" jurnalında "Gözəl Qafqaz" adlı ilk şeiri dərc olunur. 1930-1933-cü illərdə Bakıda Ali Pedaqoji İnstitutun (indiki ADPU) ədəbiyyat fakültəsində ali təhsil almışdır. Şəmkirin Zəyəm kəndində, sonra Gəncədə orta və ali məktəb müəllimi, metodist olmuşdur. 1940-cı ildən Azərbaycan Yazıçılar İttifaqında şeir bölməsində məsləhətçi, "Ədəbiyyat qazeti"ndə ədəbi işçi, məsul katib işləmiş, sonra ittifaqın məsul katibi seçilmişdir. 1944-1947-ci illərdə Yazıçılar İttifaqı İdarə Heyətinin məsul katibi, həm də idarə heyətinin üzvü seçilmişdir. 1942-ci ildən 1977-ci ilə qədər tanınmış ədəbi qəzet və jurnallarda redaktor və baş redaktor vəzifələrində çalışıb. Ə.Cəmilin yaradıcılığı olduqca genişdir və indiyədək şairin əsərlərindən ibarət 20-dən çox kitab nəşr edilib. Əsərlərində əsasən Vətən, torpaq, təbiət, uşaqların estetik-bədii tərbəsi və s. mövzular üstünlük təşkil edir. Şairin "Can nənə, bir nağıl de" uşaq şeirləri toplusu olduqca məşhurdur.

1977-cı il sentyabrın 24-də Bakıda vəfat edib və İkinci Fəxri Xiyabanda dəfn edilib. Ə.Cəmil "Qırmızı Əmək Bayrağı" ordeni (iki dəfə), Azərbaycan SSR Dövlət Mükafatı, Azərbaycan Ali Soveti Rəyasət Heyətinin fəxri fərmanı ilə təltif olunmuşdur. Bakı şəhərinin Yasamal rayonunda adına küçə, Şəmkir rayonunda məktəb var.

**Riyaziyyat fakültəsinin elmi seminarı keçirilib**



Seminarda iddiaçı Aygün Məcidovanın "İbtidai siniflərdə müasir qiymətləndirmə konsepsiyası əsasında riyaziyyat təliminin səmərəliliyinin artırılması yolları" mövzusunda riyaziyyatın tədrisi metodikası üzrə elmlər doktoru dissertasiyası işi müzakirə olmuşdur.

ADPU-nun Elmi və innovasiyalar üzrə prorektoru, professor Asəf Zamanov iddiaçının işinin aid olduğu riyaziyyatın tədrisi sahəsinin aktuallığını qeyd edib. İclasın sədri, fakültə dekanı, dosent Araz Fərəcov işin məzmununu və alınan nəticələr haqqında məruzə üçün A.Məcidovanı çıxış üçün dəvət edib. İddiaçı elmi işi barədə ətraflı çıxış elədikdən sonra iştirakçıların suallarını cavablandırıb. Sonra təqdim olunan elmi əsər haqqında prof. M.Cəbrayılov, prof. H.Əhmədov, dos. Q.Balaşov çıxış edərək müsbət fikir bildiriblər. Nəticədə ADPU-nun doktorantı A.Məcidovanın dissertasiya işinin AKK-nın qoyduğu tələblərə cavab verdiyi və onun pedaqogika üzrə elmlər doktoru alimlik dərəcəsi alması məsləhət bilinib.

# Füzuli Əsgərli - Yaradıcılığı kitablarda, xatirəsi qəlblərdə daimi məskən salmış görkəmli alim

*Heç vaxt ağlıma gəlməzdi ki, nə vaxtsa babam haqqında yazı yazmaq barədə düşünüm, hətta sağlığında belə... Amma indi - gözlənilmədən dünyasını dəyişdiyi bir vaxtda, gedişi ilə hər birimizə, xüsusilə nəvələrinə yaşatdığı bu ağrı-acı, çaşqınlıq içində ürəyimin qübarını az da olsa sərinləşdirmək üçün yazmaq istədim. Nədən başlayacağımı bilmədiyim halda, sözlər özü gəlib məni tapdı. Hərçənd ki, mən jurnalist, söz adamı deyiləm, illah da sənin kimi söz adamı haqqında söz demək bəlkə də mənə düşməzdi... Mən sənin kimi söz sərrafı ola bilmədim, başqa sənəti seçdim. Amma sənin nəvən olduğum üçün ilk dəfə məhz sənin üçün yazmağa qərar verdim. Sənin şərəfinə, sənin adına deyilən, yazılan ən gözəl sözlərin kiçik bir parçası olmaq istədim...*

*Özümü tanıyandan bəri babam haqqında yalnız xoş sözlər eşitmişəm. Babamı yaxından tanıyanlar onu indi də "halal adam", "təmənnasız şəxsiyyət" kimi dəyərləndirir, "belə insanlara nadir hallarda rast gəlmək olur" kimi səmimi sözlərlə bu vaxtsız ölümə qəlbən təəssüflənirlər. Nənəm deyir ki, babamın təmiz adı, halal zəhməti ilə qazandığı çörək ailəmiz üçün həmişə qürur mənbəyi olub. O, nəfsini məhz təmiz ada, halal zəhmətə qurban verən şəxsiyyətlərdən olub. Yaşlılar, orta nəslin nümayəndələri, gənclər, xüsusilə onun tələbələri və müəllim yoldaşları onun haqqında birmənalı olaraq "xeyirxah insan, bütöv şəxsiyyət, istedadlı filoloq-alim, həqiqi ədəbiyyatşünas" ifadələrini işlədirlər. O, çoxlarına nümunə ola biləcək bir insan olub. Babam haqq-ədalət tərəfdarıydı və ictimai fəaliyyətində olduğu kimi, şəxsi həyatında da daim bu prinsipinə sadiq qalıb. Həmişə haqq-ədalətin tərəfində dayanan, işini sevən, vicdanlı, dürüst, təmiz qəlbli və peşəsi ilə fəxr edən əsl şəxsiyyət idi.*

*...Mən babamı bir nəvənin öz babasını sevdiyindən daha çox sevirdim. Bizə gələndə içimdə qəribə sevinc hissi oyanırdı – onu başqa cür qarşılayırdım. Babam da bizi çox istəyirdi. Öz evində elə sevinclə qarşılayırdı ki, sanki hər gün getdiyimiz ev deyilmiş. Düzü, bir az da çəkinirdim, bəlkə də ona olan sevgimi çox da hiss etdirməmişəm. Bilirdim ki, bəlağətli, pafoslu sözləri xoşlamırdı, realist adam idi. Babam səsimi çox bəyənirdi. Hələ kiçik yaşlarımdan ara-sıra zümzümə edib babama qulaq asdırardım. Bir gün mənə dedi ki, "səsini iş yoldaşlarıma qulaq asdırdım, elə bildilər peşəkar müğənnidir oxuyan. Amma mən, fəxrlə dedim ki, oxuyan nəvəmdir". Həmişə zarafatla deyərdi: "Sən indiki müğənnilərdən yaxşı oxuyursan, ən yaxşı dinləyicin də mənəm". Amma indi babam yoxdur. Həyatımızda bir çox şeylər yarımçıq qaldı. Gözüm yolda qalıb, ölümünə inanmadığım yeganə insanı hələ də gözləyirəm. Bir möcüzə gözləyirəm. Bu dünyada olmadığını bilirəm, amma yenə də gözləyirəm. Axı biz heç sağollaşmadıq da... Yanvarın 17-si - babamın dünyasını dəyişdiyi gün həyatımı büsbütün dəyişdi. Həmin gün nə baş verdiyini indi də anlamaqda çətinlik çəkirəm. Çünki bu gözlənilməz itkinin vurduğu zərbə çox ağır idi. Ölümündən sonra dərk etdim ki, indiyədək babamı ölümsüz hesab edirmişəm. Elə ona görə də indi onun yoxluğunu qəbul edə bilmirəm.*

*...Səninçün çox darıxıram, baba! Bir təsəllim var: hər gün səni yuxumda görürəm, çox xoşbəxtsən yuxularımda. "Allah yaxşı insanları yanına tez alır" – deyirlər. Bax, bundan da təsəlli tapıram. Əminəm ki, Allah səni cənnətlə müjdələyib. Sənin kimi insanlar Yaradanın dərgahında ən yüksək məqama layiq görülür. Biz - 6 nəvən də daxil olmaqla – bütün ailəmiz, səninlə qürur duyuruq, fəxr edirik ki, damarlarımızda belə bir şəxsiyyətin qanı qaynayır! Allah sənə qəni-qəni rəhmət eləsin, ruhun şad olsun! Görəsən, bundan sonra yenə də sənin sevdiyin mahnıları sənsiz zümzümə edə biləcəyəmmi? Etməsəm məndən inciyəcəyini bilirəm. Heç sənin incimәyini istəyərəmmi, mənim babam?!..*

**Babam haqqında yazılanları vərəqləyirəm:**

Azərbaycan uşaq ədəbiyyatının tanınmış tədqiqatçılarından biri, filoloq alim, tərcümə nəzəriyyəçisi, tərcüməçi, fililogiya üzrə fəlsəfə doktoru, dosent Füzuli Əsgərli çox şərəfli, özünəməxsus, heç kəsə bənzəməyən bir yaradıcılıq və ömür yolu keçib. Onun iri həcmli monoqrafiyaları, dərslik və dərs vəsaitləri ("Uşaq ədəbiyyatı", "Azərbaycan uşaq ədəbiyyatı", "Dünya uşaq ədəbiyyatı"), uşaq ədəbiyyatının müasir problemlərinə həsr etdiyi elmi-nəzəri məqalələri ("Problemlər, düşüncələr", "Müasir uşaq ədəbiyyatının inkişaf mərhələləri və s.) Azərbaycan ədəbiyyatında özünəməxsus bir iz açıb. Bütün ömrünü uşaq ədəbiyyatının tədqiqinə və təbliğinə, bədii tərcüməyə və onun nəzəriyyəsinə həsr edib.

Füzuli Feyruz oğlu Əsgərli 1945-ci il martın 18-də Masallı rayonunun Çaxırlı kəndində anadan olub. Orta məktəbi bitirdikdən sonra üç il ordu sıralarında xidmət keçib. Əmək fəaliyyətinə Bakı şin zavodunda yığıcı, indiki Səttarxan adına zavodda tornaçı kimi başlayıb. 1969-cu ildə Azərbaycan Pedaqoji İnstitutunun (indiki ADPU) filologiya fakültəsinin əyani şöbəsinə daxil olan Füzuli Əsgərli hələ tələbəlik illərində təhsildə və ictimai işlərdə fəallığı ilə diqqəti cəlb edib – qrup nümayəndəsi, komsomol komitəsinə büro üzvü seçilib. "Məşəl" tələbə teatrına bədii rəhbər təyin edilməsi isə onun bacarığının, istedadının yeni məziyyətlərini üzə çıxarıb. Gənc bədii rəhbər həvəskar tələbələrin iştirakı ilə N.Hikmətin "Unudulan adam", A.Safronovun "Kişilərə inanmayın", S.Rəhmanın "Toy", "Xoşbəxtlər", A.Məmmədovun "Həmyerlilər", "Kişilər" və sair əsərləri müvəffəqiyyətlə tamaşaya qoyub. İncəsənət sahəsində ilk addımlarını atan dərnək üzvlərinin məharəti qısa zaman kəsiyində bir sıra respublika əhəmiyyətli tədbirlərdə özünü göstərib: tələbə teatrlarının respublika müsabiqəsində, radio və televiziya verilişlərində uğurla çıxış ediblər. Yeri gəlmişkən, tanınmış aktyorumuz, Azərbaycan Respublikasının Xalq artisti Ramiz Novruz məhz "Məşəl" tələbə teatrının yetirmələrindəndir. Bu gün onunla bir yerdə çalışan həmkarları - Qüdrət Umudov, Kamil Bəşirov da həmin dərnəyin fəal üzvlərindən olublar. Teatr sahəsindəki uğurlarına görə Füzuli müəllim o dövrdə SSRİ-nin "Bədii özfəaliyyətdəki uğurlarına görə" döş nişanı ilə təltif edilib.

Bütün bu uğurlardan sonra həyatını elmə, pedaqoji fəaliyyətə həsr edən Füzuli müəllimin fitri istedadı tezliklə bitib-tükənməyən potensialını üzə çıxarmağa imkan yaratdı. 1973-cü ildə ADPU-da işə qəbul edilən Füzuli Əsgərli elmi-publisistik, teatr və bədii tərcümə ilə bağlı daha intensiv fəaliyyətə başladı. Maraqlı tərcümələr edir, qəzet və jurnallar üçün publisistik və elmi məqalələr yazır, Azərbaycan radiosu və televiziyası ilə mütəmadi əlaqə saxlayırdı. Füzuli müəllimin tərcümə yaradıcılığını yüksək qiymətləndirən Azərbaycanın görkəmli şəxsiyyəti, mərhum Xalq yazıçısı İsmayıl Şıxlı ona tərcümənin nəzəri əsaslarını dərindən öyrənməyi, bu istiqamətdə dissertasiya yazmağı tövsiyə etdi. Belə bir sənətkarın diqqətini özünə cəlb etdiyindən daha da ruhlanan gənc müəllim tezliklə sanballı bir dissertasiya yazdı, uğurla müdafiə edərək filologiya elmləri namizədi elmi dərəcəsini aldı.

1994-cü ildə ADPU-nun "Ədəbiyyat və onun tədrisi metodikası" kafedrasına dosent vəzifəsinə seçilən Füzuli müəllim, eyni zamanda, 1991-1997-ci illər ərzində həmin tədris ocağının filologiya fakültəsində dekan müavini kimi çalışıb. Onu da qeyd etmək yerinə düşərdi ki, təşkilatçılıq bacarığına, səmərəli fəaliyyətinə görə bir sıra mükafatlarla, fəxri fərmanlarla təltif olunan Füzuli Əsgərli sovet dönəmində dalbadal yeddi il institut və respublika üzrə tələbə inşaat dəstəsinin komandiri kimi SSRİ-nin bir sıra ucqar bölgələrində, o cümlədən Sibirdə olub.

Füzuli Əsgərli öz elmi araşdırmalarında Azərbaycanın görkəmli uşaq yazıçısı, filologiya elmləri doktoru Zahid Xəlil



yaradıcılığına daha çox üstünlük verirdi. Bununla bağlı onun bir neçə monoqrafiyası, saysız-hesabsız məqalələri çap olunub. Zahid Xəlilin anadan olmasının 70 illik yubileyinə həsr etdiyi "Sehrli dünyanın memarı" adlı monoqrafiyasında sənətkarın poeziya, nəsr və dramaturji fəaliyyətini elmi-nəzəri aspektdə araşdırıb, tədqiqata cəlb etdiyi əsərlərin ideya-bədii və sənətkarlıq məziyyətlərinin açılmasına xüsusi diqqət yetirib. Bir çox elmi kitabların, 100-dən çox elmi-nəzəri, publisistik məqalənin müəllifi olan Füzuli müəllim "Sənətkarın uşaq dünyası", "Azərbaycan uşaq ədəbiyyatının mərhələli inkişafı", "Ömrün sözü, sözün ömrü", "Bədii tərcümə prinsipləri", "Uşaq ədəbiyyatı: qarşılıqlı yaradıcılıq qaynaqları", "Bədii təhlil və ədəbi tənqid", "Sehrli dünyanın memarı" monoqrafiyalarının, "Ədəbi düşüncələr", "Zahid Xəlilin sənət dünyası", "Problemlər, düşüncələr...", "70 ilin işığında" məqalələr toplusunun müəllifidir. "Qızıl qələm" mükafatı laureatı olan Füzuli Əsgərli tənqidçi-ədəbiyyatşünas kimi Azərbaycanın üzdə olan mətbuat orqanlarında silsilə məqalələri ilə də geniş oxucu kütləsinin maraq dairəsinə daxil olub. "Ədəbiyyat qəzeti", "Respublika", "Azərbaycan müəllimi", "Gənc müəllim", "525-ci qəzet", "Türküstan", "Mədəniyyət", "Azad Azərbaycan", "Kaspi", "Gəncənin səsi" və digər qəzetlərdə çap etdirdiyi elmi-publisistik məqalələri araşdırmaçı-mütəxəssislər tərəfindən onun alimlik fəaliyyəti və əsərləri haqqında dəyərli fikirlər formalaşdırıb.

Son illər tərcümə nəzəriyyəsində müəyyən dərəcədə boşluq hiss edən alim qələmə aldığı "Bədii tərcümə prinsipləri" (2009) monoqrafiyasında bu günümüzə qədər çap edilmiş nöqsanlı uşaq nəsr əsərlərinin təshih olunmasını və yenidən tərcümə edilərək nəşrini tövsiyə edib. Bu elmi monoqrafiyada bədii tərcümədə daha zəruri olan obrazların mənəvi-psixoloji aləminin təcəssümü, bədii tərcümədə üslub orijinallığının və milli xüsusiyyətlərin saxlanılması, atalar sözləri, məsəllər və idiomlardan istifadə üsulları problemlərinin düzgün həlli yollarını göstərib. Qırx beş il tərcümə sənətinə sadiq qalan Füzuli Əsgərli bir sıra dünya xalqları yazıçılarının əsərlərini dilimizə məharətlə çevirərək Azərbaycan oxucularına ərməğan edib. Aleksey Tolstoy, Nikolay Nosov, Yan Larri, Konstantin Sergiyenko, Eduard Vilde, Anton Tammsaare, Paul Kuusberq, Andres Yaaksoo, Albertas Laurinçukas, Miroslav İrçan, Filip Mironov, Karlo Lorensini-Kollodi, Berdinəzər Xudaynəzərov, Kaldarbay Naymanbayev, Nodar Dumbadze, Anne Vestli, Luiza Oklott və digər qələm sahiblərinin əsərləri məhz onun tərcüməsində çap olunub, bəziləri isə Dövlət televiziya və radiosuna təqdim edilib.

*Ölüm qorxulu deyil, qorxulu olan onun vaxtından əvvəl gəlməsidir. Məhz Füzuli müəllimin də vaxtından əvvəl bu dünyadan köçməsi bütün sevənlərini sarsıtdı. Dahi insanların həyatı ölümlərindən sonra başlayır. Füzuli müəllim bizə uşaq ədəbiyyatı ilə bağlı xeyli sayda dərslik, metodik vəsait, monoqrafiyalar, saysız hesabsız məqalələr, tərcümə əsərləri, eləcə də yolunu ləyaqətlə davam etdirən övladlar, nəvələr yadigar qoyub getdi. Onun övladları, nəvələri həmişə onunla fəxr edib, sonuna qədər Füzuli müəllimlə qürur duyacaqlarını bildirirlər. Sözün kitablarda, özün qəlbimizdə qalan dahi alim, ruhun şad olsun. Allah sənə rəhmət eləsin! Məzarın nurla dolsun, məkanın cənnət olsun, inşallah!*

**Müəllif: Əhmədova Röya Rasim qızı**

# İctimai həyat - tələbə təşkilatlarının faaliyəti

## Tələbələr akademik Zərifə Əliyevanın xatirəsini anıblar



Aprelin 25-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin Tələbə Həmkarlar İttifaqı Komitəsinin (ADPU THİK) İbtidai Təhsil fakültəsi təşkilatı akademik Zərifə Əliyevanın həyat və yaradıcılığına həsr olunmuş "Alim qadın, böyük ana" adlı tədbir keçirib. Tədbir tanınmış oftolmoloq-alim, ictimai xadim, akdemik Zərifə Əliyevanın anadan olmasının 98-ci ilinə həsr olunub.

"Microsoft Teams" platformasında təşkil edilən tədbirdə pedaqoqika üzrə fəlsəfə doktoru, b/m Firəngiz Kərimova Zərifə xanımın zəngin həyatı haqqında söz açıb.

Tədbirdə İbtidai təhsil fakültəsinin tələbələri Səbinə Tağıyeva, Ləman Abdullayeva, Lalə Nəsirli, Almaz Məhərrəmzadə, Aygün Nağıyeva, Ləman Hümbətova və Şəhla Qarazadə unudulmaz alimin xatirəsinə həsr olunan şeirlər səsləndirib, mahnılar ifa edib, videoçarxlar nümayiş etdiriblər.

## ADPU THİK "Virtual Könüllü" proqramına start verib

ADPU THİK-in Riyaziyyat fakültəsi təşkilatının təşkilatçılığı ilə ADPU-nun 100 illiyinə həsr olunmuş "Virtual Könüllü" proqramına start verilib. Proqram bir ay müddətində davam edəcək. Həftə ərzində bir dəfə olmaqla "Zoom" platformasında keçiriləcək beş təlimi əhatə edir. Təlim mövzuları aşağıdakılardır: "Necə Könüllü ola bilərəm?", "Könüllü olmaq mənə nələr qazandırır?", "Könüllü olmaq nə dərəcədə faydalıdır?", "Məhşur Könüllü proqramları hansılardır?", "Könüllü nə etməlidir?"



Təlimin ilk qonağı DOST Könüllü Mərkəzinin nümayəndəsi, "İlin Könüllüsü" mükafatı sahibi Xanım Həsənova, ikinci qonağı 1 saylı "Asan Xidmət" mərkəzində Könüllülər üzrə məsul şəxs Şükür Məmmədov, üçüncü qonağı Turizm Könüllü Mərkəzinin nümayəndəsi, "İlin Könüllüsü" mükafatı sahibi Ləman Namazlı olub. Təlimlər davam edir.

## "Qəlbin təmizsə, hekayən xoşbəxt bitər"




Aprelin 10-da Azərbaycan Dövlət Pedaqoji Universiteti Yeni Azərbaycan Partiyası Gənclər Birliyi (ADPU YAP GB) Kitab klubunun təşkilatçılığı ilə dünyaca məşhur türk yazıçısı Hakan Mengüç ilə "Qəlbin təmizsə, hekayən xoşbəxt bitər" adlı görüş keçirilib.

"Zoom" platforması üzərindən keçirilən, ADPU ilə yanaşı digər universitetlərdən də ümumilikdə 450-yə yaxın tələbənin qatıldığı görüşdə yazıçı Hakan Mengüç iştirakçıların suallarına cavab vermiş və müxtəlif musiqi alətləri vasitəsilə görüş iştirakçıları üçün Azərbaycanın retro mahnılarını səsləndirmişdir.

## Zəfər xəbərinin carçısı, aparıcı Jalə Həsənli ilə görüş

Aprelin 4-də Azərbaycan Dövlət Pedaqoji Universiteti Filologiya fakültəsi Tələbə Gənclər Təşkilatının (ADPU TGT) təşkilatçılığı ilə jurnalist, "İctimai televiziya"nın aparıcısı Jalə Həsənli ilə "Zoom" platforması üzərindən onlayn formada görüş keçirilib.

Görüşdə Vətən müharibəsinin ilk zəfər xəbərinin carçısı olan Jalə xanım ilk qələbə xəbərini çatdıran zaman keçirdiyi hislərini, duyğularını tələbələrlə bölüşmüş, onlarla söhbətlər aparmış, sualları cavablandırmışdır! Sonda tələbələrə öz arzularını çatdıran J.Həsənli onlara təhsillərində uğurlar arzulayıb.



## Tanınmış aktyor Kamran Yunis tələbələrin qonağı olub



Aprelin 24-də ADPU TGT-nin Kitab klubunun təşkilatçılığı ilə onlayn formada "Zoom" platforması üzərindən Azərbaycan incəsənətində özünəməxsus yer tutan, Azərbaycan teatr və kino aktyoru, rejissor, bədii qiraətçi, film səsləndirən, "ARRI", "Altın Şafran", "Vaqif Səmədoğlu" mükafatları laureatı Kamran Yunisla görüş keçirilib. Görüşdə Kamran Yunis tələbələrlə birlikdə bir-birindən gözəl şeirlər səsləndirmiş, öz fikirlərini və təcrübələrini bölüşmüş, tələbələrin mənəviyyatını, daxili aləmini zənginləşdirəcək bir çox məqamlara toxunmuş, həmçinin onların suallarını cavablandırmışdır.

## ADPU tələbələrindən "Şagirdə Tələbə Dəstəyi"

Azərbaycan Dövlət Pedaqoji Universiteti Təhsil Könüllüləri İctimai Birliyi (ADPU TKİB) tərəfindən son bir ildə dünyanı cənginə almış COVİD-19 pandemiyası səbəbindən onlayn dərslərdə nisbətən çətinlik çəkən, əsasən, şəhid, qazi ailələri və aztəminatlı ailələrin övladlarına könüllü dəstək olmaq üçün imkan yaradılıb.

Təşkilatın könüllüləri, tələbələr Aslan Heybətov və Baylər Əliyevin təşəbbüsü, təşkilatın idarə heyətinin üzvləri İsmayıl Məmmədov və Jalə Əliyevanın koordinatorluğu ilə həyata keçirilən layihə çərçivəsində 2021-ci ilin fevral-mart ayları ərzində könüllü tələbələr içərisindən elektron müraciət və videomüsahibə vasitəsilə seçimlər aparılıb. Layihəyə 32 tələbə könüllü müəllimlər kimi cəlb edilib. İkinci mərhələdə bütün ölkə üzrə elektron müraciət qaydasında aprelin birinci yarısında şagird qəbulu aparılıb. Böyük maraq cəlb edən layihəyə 200-dən çox müraciət daxil olub ki, onlardan təxminən 120 şagird layihəyə qəbul edilib.




Aprelin 21-dən "Microsoft Teams" platformasında praktik olaraq start götürən dərslər tədris ilinin sonunadək iki ay ərzində xüsusi cədvəl əsasında II-IX siniflər üzrə ümumiləşdirmə, izah və mənimsətmə xarakteri daşıyaraq siniflər üzrə il ərzində keçirilən bütün məzmunu əhatə edir.

Çoxsaylı müraciətlərə əsasən videomüsahibə əsasında layihədə dərs demək hüququ qazanan 32 tələbə-müəllim hazırda onlayn dərsləri 17 fərqli rayon və şəhərdən qoşulmaqla tədris edirlər (Bakı, Sumqayıt, Abşeron, Bərdə, Şəmkir, Şirvan, Biləsuvar, Qobustan, Salyan, Quba, Ordubad, Beyləqan, Naftalan, Ağstafa, Füzuli, Şamaxı, Tovuz).

Dərslərdən yararlanan 120-dək şagird 23 fərqli rayon və şəhərdən dərslərə qatılır (Bakı, Sumqayıt, Ağdam, Qəbələ, Xaçmaz, Tərtər, Quba, Oğuz, Xızı, Sabirabad, Şamaxı, Gəncə, Ağsu, Naftalan, Cəlilabad, Bərdə, Masallı, Qubadlı, Abşeron, Qobustan, Samux, Beyləqan, Yardımlı).

Layihə çərçivəsində II, III və IV siniflərin hər birində 6, V sinifdə 8, VI sinifdə 9, VII sinifdə 11, VIII və IX siniflərin hər birində isə 10 fənn olmaqla ümumilikdə 8 sinif üzrə 66 fəndən şagirdlərin hazırlıq səviyyəsinin artırılmasına dəstək verilir.

İlk həftənin nəticələrinin təhlili layihənin uğurlu başlanğıcı haqqında fikir söyləməyə əsas verir. Bununla belə, universitetin və ADPU TKİB-in nümayəndələrindən ibarət təşkilat komitəsi mütəmadi olaraq prosesə nəzarət edir, müəllimlərlə müntəzəm onlayn görüşlər keçirilir.

O cümlədən bildirək ki, təşkilatın digər böyük layihəsi, tələbələr üçün onlayn praktik vikipediya təlim kursu - "#VİKİADPU" yekunlaşıb. Ümumilikdə təlim kursu çərçivəsində vikipediyaya 48 yeni məqalə əlavə olunub, 15 məqalədə əsaslı redaktə aparılıb, o cümlədən "Vikicommons"a müxtəlif kateqoriyalar üzrə 60-a yaxın orijinal foto əlavə edilib. Fotolar əsasən ADPU və Vətən müharibəsi şəhidləri ilə bağlı materiallardır.

Tiraj - 500
Şəhadətnamə - № 191

# GƏNC MÜƏLLİM QƏZETİ

ADPU 100

## ADPU və STEAM təhsil

XXI əsrin müvəffəqiyyətli yenilikçi tələbələrin hazırlanması üçün elm, texnologiya, mühəndislik, incəsənət və riyaziyyat fənləri üzrə bilikləri özündə ehtiva edən STEAM-təhsilinə maraq getdikcə daha çox artır. Təhsil sahəsində bir çox ekspertlər STEAM-ı XXI əsr kompetensiyalarının formalaşmasının ən mühüm təhsil modeli hesab edirlər.

**Niyə STEAM təhsil vacibdir?**

Müasir dünyada tələbələrin gələcək uğura hazırlığı tənqidi düşünmə bacarıqlarının inkişafı üçün bu fənlərlə bütöv tanışlıq deməkdir. "Təhsil dəyişən dünyaya reaksiya vermək üçün təzyiq altındadır" fikrini deyən Financial Times məqaləsində yazıçı Jivan Vasagar iddia edir ki, təkrarlanan vəzifələr texnologiya tərəfindən məhv olduğundan, yeni vəzifələri yerinə yetirmək kimi qabiliyyətlər getdikcə daha da əhəmiyyətli olur. STEAM sistemi tələbələrə tənqidi düşünmək, problemləri həll etmək və yaradıcılıq potensialından istifadə etmək bacarıqlarını aşılayacaq. Bundan başqa ABŞ-ın Əmək Statistika Bürosunun hesabatında STEAM və onunla əlaqəli peşələrin sayı 2029-cu ilə qədər 8% artacağı proqnozlaşdırılır.

STEAM təhsil modelinin tətbiqinin əhəmiyyətli dərəcədə artmasında ABŞ Təhsil Nazirliyinin söylədiyi fikirlər də həlledici rol oynamışdır. Belə ki, ABŞ Təhsil Nazirliyinin söyləmişdir: "Daim dəyişən dünyada tələbələr üçün problemlərin həlli istiqamətində yeni bilik və bacarıqların gətirilməsi, məlumatların dərk edilməsi və qərarların qəbul edilməsi kimi sübutların necə toplanılacağını habelə onların necə qiymətləndiriləcəyini bilmək üçün hər zamankindən daha çətin bir dünyaya qədəm qoyuruq". Bu bacarıqların inkişafı STEAM-in öyrənilməsinin əsasını təşkil edir. Bundan başqa Abet şirkətinin icraçı direktoru Maykl Miligan söylədiyi fikri xüsusilə qeyd etmək olar: STEAM məzunları hal-hazırda qarşılaşdığımız ictimai səhiyyə böhranı (COVİD – 19) kimi sosial problemlərin həllərinin inkişafında mühüm rol oynayırlar. Bu təhsil yanaşmasının əhəmiyyətli bir hissəsi, STEAM təhsil çərçivəsində təhsil alan tələbələrin mövzunu yalnız öyrənməsi deyil, mövzunun necə öyrənilməsi, həmin mövzu ətrafında sualların necə verilməsi və mövzuya aid biliklərin necə sınaqdan keçirildiyini öyrənmələri daha çox aktualdır.

Məlumdur ki, STEAM-dən əvvəl Amerikada STEM təhsil modeli yaranmışdır. STEM-ə "İncəsənətin" (Art) əlavə edilməsi ilə onu STEAM modeli kimi təqdim edən 2006-cı ildə STEAM təhsil sisteminin təsisçilərindən biri olan mühəndislik və texnologiya müəllimi – Jorjetta Yakmandır. Bu dəyişikliyi Yakman belə izah edir: "STEAM STEM sahəsində təsviri incəsənət və dizayn düşüncəsinin konvergensiyasından daha çoxdur". Bundan başqa Amerikada Rod-Aylend dizayn məktəbi STEAM yaratmaq üçün STEM quruluşuna incəsənət əlavə etmək üçün bu həyati əhəmiyyətli "sənət və elm arasında simbioz" olduğunu ifadə etdi. Bu dizayn məktəbinə görə STEAM-in məqsədi rəssam və ya dizaynerlə alim və ya texnoloqun bir araya gələn əsl yeniliklərini təşviq etməkdir.

Dünyada STEAM-də ixtisaslaşmaq istəyən müəllimlər üçün sertifikatlar və ixtisasartırma proqramları daxil olmaqla bir sıra təhsil imkanları mövcuddur. Azərbaycanda da STEAM təhsilin inkişafı və tətbiqi əsas diqqət mərkəzindədir. Belə ki, 2021-ci il Fevralın 2-də Azərbaycan Prezidenti İlham Əliyev "Azərbaycan 2030: sosial-iqtisadi inkişafın Milli Prioritetləri" sənədinin təsdiq olunması barədə sərəncam imzalamışdır. Həmin sənədə əsasən növbəti onillikdə ölkənin sosial-iqtisadi inkişafına dair beş Milli Prioritetdən biri olan "rəqabətli insan kapitalı və müasir innovasiyalar məkanı" prioritetini reallaşdırılması göstərilir. Bu da "STEAM Azərbaycan" layihəsinin rolunu və əhəmiyyətini artırılmasında böyük təkan rolu oynamışdır.

2020/2021 tədris ilində Təhsil Nazirliyi tərəfindən Bakı şəhərində ümumilikdə 6000-dən çox VI sinif şagirdinin təhsil aldığı 42 ümumi təhsil müəssisəsində STEAM layihəsinin tətbiqinə başlanılıb. Layihənin tətbiq edildiyi ümumi təhsil müəssisələri Təhsil Nazirliyi tərəfindən zəruri təlim avadanlığı və inventarlar ilə təmin edilmişdir. Həmin müəssisələrdə STEAM üzrə müəllimlərin hazırlanması məqsədilə 2019-cu ildə 01-31 mart və 17 noyabr-10 dekabr tarixlərində ümumi 100 nəfərlik müəllim heyəti olmaqla iki qrup İsrailə təlimlərə ezam olunmuşdular. Bundan başqa STEAM təhsilini tədris etmək üçün 34 məktəbdən 104 müəllim 2020-ci 2-14 sentyabr tarixlərində peşəkar heyət tərəfindən keçirilən təlimlərdə iştirak etmişdilər. Bununla yanaşı olaraq STEAM layihəsi ilə əlaqədar nazirlik tərəfindən steam.edu.az portalı da istifadəyə verilib. Portalda STEAM təhsili üzrə yeniliklər, layihə üzrə görülən işlər və nəzərdə tutulan tədbirlər barədə məlumatlar yerləşdirilir.




ADPU-da STEAM təhsil modelinin dünyada və Azərbaycanda inkişaf dinamikasını diqqətlə izləyir və buna dair universitetdaxili işlərin görülməsinə start verilmişdır. Belə ki, 2020-ci il ADPU-nun Fizika fakültəsinin eksperimental qrupunun III və IV tədris ili tələbələrinin ümumilikdə 50 nəfəri STEAM üzrə Azərbaycanda ilk və yeganə şirkətlərdən biri "Engennering for Kids" şirkətində təlimlərdə iştirak etmiş və STEAM üzrə Beynəlxalq sertifikatlarla təltif edilmişlər. Bu təlimlərdə onlar STEAM-ın aktuallığı və bu modelin tətbiqi ilə əlaqəli Robot texnologiyası ilə praktik tanış olmuşlar. Bundan başqa həmin şirkətin nümayəndələri eksperimental qruplara STEAM üzrə 30 saatlıq mühazirə demişlər. Eyni zamanda fakültənin IV tədris ili tələbələri ölkədə bu sahədə ilk lisey olan Hədəf STEM liseyində təcrübə keçərək liseyin fəaliyyəti ilə yaxından tanış olmuşlar.

Cəmiyyətin tərəqqisi bu gün gənc nəslə nəyi və necə öyrətməyimizdən asılıdır. Bu məqsədlə 2019-cu il tarixində ADPU-da Fizika fakültəsinin təşkilatçılığı ilə keçirilən "STEM və müasir müəllim hazırlığı" I Respublika Forumunu pedaqoji kadr hazırlığında yeni innovativ addım hesab etmək olar. Eksperimental qrup tələbələrin STEAM üzrə hazırladığı məhsullar forumda nümayiş etdirilmişdir. Foruma olan maraq və dəstəyi Azərbaycanın bir çox rayonlarından (İsmayıllı, Siyəzən, Xızı və s.) qatılan müəllimlərin çıxışlarından da görmək olardı. Qeyd edək ki, bu Forumda STEAM üzrə tanınmış mütəxəssislər Ceyhun Cabarov, Yalçın İslamzadə, Fatimə Zülfüqar, Aliyə Əhmədova təqdimatla çıxış ediblər. Bundan başqa 2019-cu il 19 sentyabr tarixində Fizika fakültəsinin tələbələrinin bir qismi Hədəf liseyinin təşkil etdiyi "Hədəfdə STEM" adlı I Beynəlxalq konfransda iştirak etmişlər. Bundan başqa 5-13 aprel 2021-ci il tarixlərində Azərbaycan Respublikasının Təhsil Nazirliyi tərəfindən başladılan və Təhsil İnstitutu tərəfindən icra olunan "STEAM Azerbaijan" layihəsi çərçivəsində Azərbaycan Dövlət Pedaqoji Universitetinin Fizika fakültəsinin tələbələri üçün növbəti STEAM təlimləri keçirilmişdir. Təlimlər zamanı iştirakçılara STEAM metodologiyaları, 3D modelləşdirmə və çap, birplatalı platformalarda kodlaşdırma (Micro:bit) modulları öyrədilib. Orada tələbələrimiz bir sıra maraqlı modellər hazırlamış və həmin modellərin tədrisi metodologiyası ilə tanış olmuşlar. Sözügedən təlimlər Beynəlxalq və yerli sertifikatlara malik, İsraildə və Azərbaycanda bir sıra təlimlərdə iştirak etmiş təlimçilər tərəfindən aparılmışdır. Bütün iştirakçılar təlimləri müvəffəqiyyətlə bitiriblər və təlimlərdə iştirak ilə bağlı sertifikat əldə etmişlər. Qeyd edək həmin tələbələrdə STEAM müəllimliyi üzrə müəyyən peşə kompetensiyaları formalaşmış və bu da əmək bazarı habelə bu sahə üzrə maraqlı tərəflərdən bir sıra iş təklidləri gəlmişdir. Ümumilikdə 25 tələbənin iştirakı ilə keçirilən təlimlərin yeni modullar üzrə davam etdirilməsi planlaşdırılır. Fizika fakültəsi rəhbərliyinin təlimçilərdən mütəmadi şəkildə aldığı məlumatlara əsasən tələbələrimiz STEAM mərkəzlərində yüksək həvəslə bu günün tələbatına çevrilən STEAM tədris modelinin tətbiqinin pedaqoji aspektlərini mənimsəməyə çalışmış və göstərdikləri fəaliyyətə görə rəğbətləndirici mükafatlar almışdılar. ADPU-da STEAM üzrə müəllim hazırlığının konsepsiyasının hazırlanması istiqamətində davamlı işlər gedir və yaxın gələcəkdə ADPU STEAM müəllimlərin hazırlanması mərkəzinin yaranması ən aktual məsələyə çevrilmiş və artıq ADPU-nun 29 apreldə baş tutan Elmi Şurasında STEAM mərkəzinin yaranması ilə bağlı qərar qəbul olunmuşdur.

**Fizika fakültəsinin dekanı, dosent Arzu Daşdəmirov**
**"Keyfiyyətin Təminatı" şöbəsinin müdiri, dosent Qalib Şərifov**

## BAŞSAĞLIĞI



Müəllim **Əlirza Əyyubov** | Tarixçi-alim, elmlər doktoru **Kamil İbrahimov** | Riyaziyyat fakültəsinin keçmiş dekanı, professor **Maqsud Nəcəfov**

## Redaksiya heyəti



Qəzet "Gənc Müəllim" qəzetinin redaksiyasında yığılıb, səhifələnib və "Azərbaycan Nəşriyyatı"nda çap olunub. Sifariş №: 840

Ünvan: Bakı şəhəri, Səbail rayonu, Ü.Hacıbəyli küçəsi, 68 / Əlaqə: +994 50 868 08 33 / Qəzetdə qeyd edilən faktlara görə redaksiya məsuliyyət daşımır.